© *“Metafizika” Journal*
*2023, vol 6, issue 3, serial 23, pp.111-118*

*p-ISSN 2616-6879*
*e-ISSN 2617-751X*

## RESENZİYA

**MJ №** 181

# “Heydər Əliyev və yeni liderlik: fəlsəfi-elmi təhlil” əsəri haqqında dəyərləndirmə

**Ələddin Məlikov***




**Kitabın adı:** Heydər Əliyev və yeni liderlik: fəlsəfi-elmi təhlil
**Müəllif:** Füzuli Qurbanov
**Kitabın dili:** Azərbaycan dili
**Nəşr ili:** 2023
**Səhifəsi:** 324
**Nəşriyyat:** Elm və təhsil
**Ölkə:** Bakı, Azərbaycan
**470200000** **Qrifli nəşr**
**N-98-2023**

## 1.Giriş

Füzuli Qurbanovun “Heydər Əliyev və yeni liderlik: fəlsəfi-elmi təhlil” kitabı AMEA Fəlsəfə və Sosiologiya İnstitutunun Elmi Şurasının 05.04.2023-cü il tarixli, 02 saylı iclasının qərarı ilə çapa məsləhət görülmüşdür. Əsərin elmi redaktorları prof.İlham Məmmədzadə və t.e.d.Eynulla Mədətli, rəyçiləri prof.Etibar Nəcəfov, prof.Cahangir Məmmədov və redaktoru Qabil Camalovdur [1].

## 2.Füzuli Qurbanovun yaradıcılığı və əsərləri

Füzuli Məhəmməd oğlu Qurbanov 23.09.1959-cu ildə Gürcüstan Respublikası, Dmanisi rayonu, Az.Gəyliyən (indi: Gəyliyən) kəndində anadan olmuşdur. 1977-ci ildə həmin kənddə orta məktəbi bitirərək, Azərbaycan Dövlət Universitetinin “Mexanika-riyaziyyat” fakültəsinə daxil olub.

---

* Fəlsəfə üzrə fəlsəfə doktoru, dosent,
AMEA Fəlsəfə və Sosiologiya İnstitutunun aparıcı elmi işçisi; Bakı, Azərbaycan
E-mail: aladdin.malikov@gmail.com
https://orcid.org/0000-0001-5830-6764

Məqaləyə istinad: Məlikov, Ə. [2023] “Heydər Əliyev və yeni liderlik: fəlsəfi-elmi təhlil” əsəri haqqında dəyərləndirmə. *“Metafizika” jurnalı, 6(3),* səh. 111-118.

**Resenziyanın tarixçəsi:**
*Resenziya redaksiyaya daxil olmuşdur: 20.06.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 20.07.2023*
*Çapa qəbul edilmişdir: 01.09.2023*

1982-ci ildə universitetdə təhsilini başa vurub təyinatla Kəlbəcər rayonunun Qaragüney kəndinə göndərilib və burada 1985-ciilədək orta məktəbdə müəllim işləyib.

Füzuli Qurbanov 1985-1986-cı illərdə SSRİ "Fəlsəfə Cəmiyyəti"nin Azərbaycan şöbəsində məsləhətçi vəzifəsində çalışıb. 1986-cı ildə isə SSRİ Fəlsəfə İnstitutunun əyani aspiranturasına daxil olub. 1990-cı ildə Moskvada namizədlik dissertasiyasını müdafiə edərək, fəlsəfə doktoru elmi dərəcəsinə layiq görülüb. Qeyd edək ki, Füzuli Qurbanov sinergetikanın fəlsəfi metodoloji problemləri üzrə elmi iş müdafiə edən ilk azərbaycanlı alimdir.

O, həmçinin 1990-1993-cü illərdə Azərbaycan EA-nın Fəlsəfə və Hüquq İnstitutunda elmi işçi, 1993-1995-ci illərdə dosent əvəzi vəzifəsində çalışıb. 1995-ci ildə köçürmə yolu ilə Azərbaycan Respublikası Milli Məclisi yanında Humanitar Tədqiqatlar və Proqnozlaşdırma Mərkəzinin birinci şöbəsinin müdiri vəzifəsinə təyin olunub. 1997-ci ildə həmin mərkəz ləğv edildikdən sonra o, yenidən Azərbaycan EA-nın Fəlsəfə və Hüquq institutunda dosent kimi fəaliyyətə başlayıb və hazırda "İdrak nəzəriyyəsi və məntiq" şöbəsinin müdiridir.

"Sinergetikanın sosial sistemlərə tətbiqi imkanları" mövzusunda yazdığı doktorluq dissertasiyasını da müdafiə edərək fəlsəfə elmləri doktoru elmi dərəcəsinə layiq görülmüş Füzuli Qurbanov bir sıra beynəlxalq elmi konfransların iştirakçısı olub, elmi məruzələrlə çıxışlar edib. O, 7-dən çox monoqrafiyanın, 130-dan çox elmi məqalənin müəllifidir. Müxtəlif elmi jurnallarda və qəzetlərdə onlarla elmi və analitik xarakterli məqalələri dərc olunub.

Füzuli Qurbanovun "Sinergetika: xaosun astanasında" (Bakı, Bakı Universiteti, 2004, 360 səh.), "Elmə sinergetik yanaşma" (Bakı, Elm, 2005, 400 səh.), "Avtopoyesiz və sinergetika: sosial təşəkkül metodları" (Bakı, Adiloğlu, 2007, 480 səh.), "Tarixin "postqərb" mərhələsinə keçid" (I cild. Risklər, proqnozlar və ssenarilər. Bakı, Təknur, 2009, 420 səh.) adlı monoqrafiyaları filosoflar tərəfindən yüksək qiymətləndirilib. Eləcə də onun "Sosial qrupların dinamikası" və "Sinergetikanın sosial sistemlərə tətbiqi imkanları" adlı proqramları çap olunub və universitetlərdə tədris olunur.

**3.Əsərin məzmunu**

Müəllif kitaba "Ön söz"lə başlayır. Burada Heydər Əliyevin şəxsiyyət kimi davranışları, bir vətəndaş olaraq mövqeyi, başçı-lider vəhdətində dövlət xadimi kimi Azərbaycana olan böyük sevgisindən söhbət açılır. Sonra isə Heydər Əliyevi dövlət başçısı və lider kimi doğru anlamaq üçün Azərbaycanın müstəqilliyini ürəkdən sevmənin zəruri olduğu vurğulanır.

Əhəmiyyətli mövzuların vurğulandığı "Giriş"də isə liderlik fəlsəfəsinin olub-olmaması haqqında filosofların fikir və arqumentlərindən bəhs edilir.

Əsərdə həm də liderlik fəlsəfəsi üç məqamda izah edilmişdir: 1. Liderliyə fənlərarası metodologiya prizmasından yanaşılıb. Qədim dövrlərdən bu günə qədər lider ayrıca şəxsiyyət olaraq araşdırılıb. Bu kitabda liderə həm dövlət başçısı-lider həm də lider-cəmiyyətin sosial-mədəni, demoqrafik özünütəşkili aspektlərinin vəhdəti kimi baxılmışdır; 2. Liderliyin fəlsəfi-elmi tədqiqi konkret hazırlanıb, fənlərarası metodologiya fonunda verilmişdir; 3. Azərbaycanda liderlik ənənəsi və müasir mərhələdə formalaşan yeni liderlik modelinin dərkinə tətbiq etməyə cəhd kimi fəlsəfi-elmi qənaətlər konkret olaraq göstərilmişdir. Ümumiyyətlə liderlik anlayışı aksioma kimi götürülüb, bu səbəbdən liderlik anlayışından sonrakı suallara cavablar verilir. Aydındır ki, liderlik idarə etmək deməkdir. İdarə etmək isə Emil Jirardenin ifadəsi ilə desək, “İdarə etmək öncədən görmək deməkdir”.

**4.Kitabın fəsilləri haqqında**

Kitab mövzu baxımından altı əsas fəsilə ayrılır:

1. İlk fəsildə müəllif “Liderliyin fəlsəfi-elmi refleksiyasının metodoloji əsasları haqqında” mövzusunu təhlil edir. Burada əsas nəzəri və metodoloji qeydlər, fənlərarası metodologiyanın başlıca özəllikləri, əsas prinsipləri və liderliyə tətbiq imkanlarının olub-olmaması, Platon və Aristotellə dialoq prizmasında fəlsəfi-siyasi analiz və bir sıra ümumiləşdirmələr edir.
2. “Liderlik fəlsəfəsinin mümkünlüyü: məsələnin ümumi qoyuluşu” adlanan ikinci fəsildə müəllif daha çox liderlik fəlsəfəsinə dair yanaşmalar haqqında geniş məlumat verir. Sonra liderlik fəlsəfi refleksiyasını tarixi rakursda ortaya qoyur. Bu mərhələni liderlik haqqındakı təlimlərdə başlıca fəlsəfi məqamlar baxımından üç əsas hissəyə bölür: XIX əsrin sonlarına qədərki mərhələ; XX əsr və XXI əsrin ilk onillikləri. Sonda yenə də liderlik haqqında bir sıra fəlsəfi və elmi ümumiləşdirmələr göstərilir.
3. Üçüncü fəsil “Liderlik cəmiyyətin özünütəşkili və mədəniyyət özəllikləri kontekstində: fənlərarası yanaşma” adlanır. Bu fəsil liderliyin kross-kültür analizi haqqında məlumatlar və təhlillərə başlayaraq toplumun özünütəşkil sinergetikası və liderlik: fənlərarası yanaşma prizmasında fəlsəfi təhlili ilə davam edir. Xülasə şəklində izah etsək, liderin toplumu necə formalaşdırması məsələləri nəzəri şəkildə vurğulanır. Sonrakı başlıqda isə çox doğru olaraq, fənlərarası yanaşma kontekstində Azərbaycan cəmiyyətinin özünütəşkili və liderlik ənənəsi izah edilir. Yekunda bir sıra fəlsəfi və elmi ümumiləşdirmələr aparılmışdır.
4. Dördüncü fəsil “XX əsrdə Azərbaycanda lider və liderlik: fəlsəfi-elmi özəlliklər (1918-1993-cü illər)” adlanır. Bu fəsildə dörd əsas bölmə var. Birinci bölmədə nəzəri və metodoloji xarakterli qeydlər yer alır. Sonrakı bölmədə passionar türklər: tayfalar birliyindən xalq səviyyəsinə keçidin dinamikasına fəlsəfi-elmi yanaşmalar verilir. Üçüncü bölmədə İkinci

Respublika dönǝmindǝ rǝhbǝrliklǝ liderliyin özǝl nisbǝti araşdırılır. Yekunda ǝnǝnǝyǝ sadiq qalaraq fǝslin nǝticǝsi kimi bir sıra fǝlsǝfi-elmi ümumilǝşdirmǝlǝr aparılır.

5. "Müstǝqillik: dövlǝtçilik vǝ liderliyin yeni mǝrhǝlǝsi" adlı beşinci fǝsildǝ müǝllif sǝrt siyasi rejimdǝn sonra yeni liderlik modeli axtarışları ilǝ ǝlaqǝdar fikir vǝ nǝzǝriyyǝlǝri şǝrh edir. Burada müxtǝlif nǝzǝriyyǝlǝr gǝtirilǝrǝk tǝhlil vǝ tǝnqid edilir. Sonra xilaskarlıqla quruculuğun sintezinin özǝlliyi prizmasında Azǝrbaycanda yeni liderlik modelinin fǝlsǝfi aspekti tǝqdim edilir. Üçüncü başlıqda isǝ Azǝrbaycanda Ümummilli Liderliyin fǝlsǝfi analizi: birlǝşdirici-qurucu-yeni lider yetişdirǝn liderlik nümunǝsi haqqında ǝtraflı mǝlumatlar verilir. Nǝticǝ olaraq yenǝ bir sıra fǝlsǝfi vǝ elmi ümumilǝşdirmǝlǝr aparılmışdır.

6. "XXI ǝsrdǝ yeni liderlik modellǝri axtarışları: tarixin "postqǝrb" mǝrhǝlǝsinǝ doğru" başlıqlı sonuncu fǝsildǝ "Postqǝrb" mǝrhǝlǝsinin rǝqǝmsal mǝdǝniyyǝti vǝ liderlik mözusunu analiz edǝrǝk, istifadǝ olunan anlayışların fǝlsǝfi izahı vermǝyǝ çalışılır. Hǝmçinin hǝmin kontekstǝ "sinqulyar keçid" ifadǝsini daxil edir. Sonra şǝxsi liderliklǝ ölkǝ liderliyi sintezinin strateji özǝlliklǝri adlı başqa bir mövzuya toxunulur. Yeni liderliyin Azǝrbaycan modelinǝ fǝlsǝfi-elmi baxışı tǝhlil edilir. Burada ǝsasǝn insanların liderlǝri xilaskar kimi görmǝk arzusu vurğulanır vǝ tǝdqiq edilir. Nǝhayǝt yeni liderlikdǝ növbǝti mǝrhǝlǝ kimi "sinqulyar keçid" astanasında güclü dövlǝt vǝ böyük millǝt quruculuğu sahǝsinǝ diqqǝt yetirilir. Burada "Zǝfǝr fǝlsǝfǝsi"nin başlıca mǝqamları sadalanır. Burada ǝsasǝn dörd aspekt fǝlsǝfi vǝ elmi cǝhǝtdǝn analiz edilir: birinci, mǝnǝvi-ǝxlaqi, ikinci, tarixi-mǝdǝni, üçüncü, siyasi-ideoloji vǝ dördüncü, hüquqi. Hǝmçinin sonda bir sıra fǝlsǝfi-elmi ümumilǝşdirmǝlǝrdǝn öncǝ, postmünaqişǝ mǝrhǝlǝsindǝ yeni liderliyin başlıca fǝlsǝfi özǝlliklǝri kimi strateji inkişaf sǝnǝdlǝrindǝ liderliklǝ bağlı mǝqamlar vǝ böyük millǝt quruculuğunun fǝlsǝfi aspektinǝ dair mövzular tǝdqiq edilir. Burada Azǝrbaycan üçün "Böyük millǝt" anlayışının etnik mǝnsubluq mǝnasında işlǝdilmǝmǝsi xüsusilǝ vurğulanır. Hǝmçinin Azǝrbaycan Respublikası dövlǝtinin multikulturalizm siyasǝtini prioritet hesab etmǝsi vǝ ǝmǝli fǝaliyyǝtindǝ bunu reallaşdırmasının tǝsadüfi olmadığı qeyd olunur.

**5.Dǝyǝrlǝndirmǝ**

Monoqrafiya Ulu Öndǝr Heydǝr Əliyevin liderliyi kontekstindǝ liderliyin fǝlsǝfi-elmi tǝhlilinin tǝdqiqinǝ hǝsr edilmişdir. Hǝmin mǝqsǝdlǝ liderlik haqqında fǝlsǝfǝ tarixindǝ mövcud olan fikirlǝr vǝ nǝzǝriyyǝlǝr ümumilǝşdirilmiş vǝ onlar müasir fǝlsǝfi-elmi idrak kontekstindǝ tǝhlil edilmişdir.

Kitabda Azərbaycanda liderliyin, xüsusilə Heydər Əliyev liderliyinin bir mütərəqqi təcrübə kimi fəlsəfi-elmi tədqiqinə diqqət çəkilib və araşdırılıb, ümumi şəkildə nəzər salsaq Heydər Əliyevin lider və dövlət başçısı kimi fəaliyyətinə fənlərarası kontekstdə yeni fəlsəfi-elmi yanaşmadır. Məhz bu kontekstdə daha əhəmiyyətli olan isə Azərbaycanda ilk dəfə konkret fənlərarası metodoloji prinsiplər prizmasında Heydər Əliyevin liderliyinin tədqiqinə cəhdin göstərilməsidir. Bu həm tərifəlayiq həm də təqdirəlayiqdir. Çünki bu sahədə araşdırma aparanlara sanki bir nümunə xarakteri daşıyacaq və ilk mənbə kimi həm metodik olaraq həm də fənlərarası kontekstdə yeni üslubla təqdim edilmiş bir ciddi elmi əsər olaraq istifadə ediləcəkdir.

Lakin bütün bunlarla yanaşı bəzi məqamlar da vardır ki, bunlara diqqət edilməsi işin gələcəkdə təkmilləşməsinə səbəb ola bilər. Bu səbəbdən əsərə dair tənqidi yox, sadəcə dəyərləndirmə müstəvisində bəzi qeydlərin edilməsi və mövzuya uyğun bəzi məqamların bildirilməsi tədqiqatın daha da kamilləşməsinə xidmət edə bilər. Ümidavarıq ki, göstərilən qeydlər əsərin gələcək nəşrlərində aradan qaldırılacaq. Təbii ki, hər bir əsərə fərqli yanaşmalar ola bilər. Hər halda istənilən əsərdə bəzi çatışmamazlıqların olması labüddür. Lakin bunları bildirmək normal qarşılanmalıdır. Doğrusu burada yeri gəlmişkən bir iradı cavablandırmaq istəyirəm. Bəziləri bildirir ki, məsləhətli olardı ki, qeydlərinizi müəllifə verərdiniz. Əks təqdirdə birdən kimsə duyar və ya tənqidə məruz qalan müəllif nüfuzdan düşər. Beləliklə sanki məsləhətli tənqid formatını təqdim edirlər. Bu fikirlə razı deyiləm. Çünki əvvəla tənqid “təhqir” deyil. İkincisi dəyərləndirmə heç tənqid də deyil. Üçüncüsü, bu dəyərləndirmələr inkişafa səbəb olmaq üçün qeyd edilir. Dördüncüsü, hansısa bir dahi demişdi ki, özümüz, bir-birimizlə dava-dalaş salmaqdansa, təki fikirlərimiz dalaşsın. Yəni hər hansı bir əsəri dəyərləndirmə əslində onu cəmiyyətə təqdim etmə, orada yazılan nəzəriyyələri oxumağı məsləhət bilməkdən keçir. Yanlış düşünüb bu qeydləri müəllifin şəxsiyyətinə hücum, qaralama, gözdənsalma, nüfuzuna xələlgətirmə kompaniyası kimi hesab etmək doğru deyildir. Beşincisi isə odur ki, istənilən bir müəllif fikir və nəzəriyyələrini açıq şəkildə yazırsa, o zaman açıq şəkildə tənqid və ya dəyərləndirməyə də razılıq verməli və hazır olmalıdır. Qeydləri tənqid olunan müəllifin qulağına pıçıldadınsa, artıq o tənqid yox, olsa-olsa nəsihət ola bilər. Altıncısı budur ki, bu tənqid və dəyərləndirməni bəlkə müəllif qəbul etməyəcək və hər bir cümləsinə belə şəxsi cavabı vardır. O zaman öz arqumentlərini və nəyi niyə etdiyini açıqlayacaq və beləliklə oxucular daha dərin və dəqiq məlumat əldə edəcəklər.

Hər şeydən öncə qeyd edilməlidir ki, belə bir sanballı əsərə kitablar üçün beynəlxalq standard nömrəsi nəzərdə tutulan, başqa sözlə, kitabın pasportu sayılan “ISBN” alınmamış və kitabda öz əksini tapmamışdır. Nəticə etibarı ilə elmi bazalarda, o cümlədən dünya kitabxanalarının qlobal fəaliyyətlərini özündə ehtiva edən beynəlxalq təşkilat “OCLC” və onun nəzdində dünya kataloq sistemi kimi fəaliyyət göstərən “Worldcat” kimi nəhəng elmi sistemlərdə müşahidə edilməməkdədir. (OCLC bazası barədə ədəbiyyatda göstərilən mənbədən ətraflı məlumat əldə edə bilərsiniz) [2]. Həmçinin müəllifin yazarların ID kodu kimi xarakterizə edilən “ORCID” nömrəsi də kitabda yer almamaqdadır. (“ORCID” barədə ədəbiyyatda göstərilən mənbədən ətraflı məlumat əldə edə bilərsiniz) [3].

Digər bir məsələ “başçı”, “rəhbər”, “siyasi lider”, “milli lider” və “ümummilli lider” və s. anlayışlarının tərifi, xüsusiyyətləri, bir-birilə fərqi və fəlsəfi tədqiqi aydın şəkildə verilməmişdr. Sanki bu anlayışların ya bir-birilə fərqi yoxdur ya da eynimənalı məfhumlardır. Əlbəttə bəzən yeri gəlmişkən mətnə uyğun olaraq qısa da olsa izahlar verilmişdir. Lakin aydındır ki, Ulu Öndər Heydər Əliyev real fəaliyyəti ilə bunların hər birini geçərək, özünəxass nümunə yaratmış və Azərbaycan liderlik ənənəsində ilk dəfə olaraq “Ümummilli Lider” səviyyəsinə yüksəlmişdir.

Əsərdə eyni sözün bir neçə cür yazılması, bununla yanaşı kitabda səhlənkarlıq və ya diqqətsizlik üzündən bəzən sadə hərf səhvləri, söz və söz tərkibləri yanlış yazılmış bəzən isə məzmuna xələl gətirən səhvlər görünməkdədir. Bütün bunları texniki səhv hesab edib, üzərində dayanmağı zəruri hesab etmirik.

Kitabın əsas problemlərindən biri də budur ki, hörmətli müəllif mətndə olan mürəkkəb və anlaşılmayan bəzi terminlərin lüğəti mənasını terminoloji tərifini və başqa dillərə məxsus çətin kəlmələri, həmçinin bəzi tarixi şəxsiyyətlərin barəsində müxtəsər də olsa izah verməmişdir. Çünki elə terminlər vardır ki, onları izahsız başa düşmək çətin, bəzən də mümkün deyildir. Lakin müəllif bunları aydınlaşdırmağı unutmuşdur. Sanki kitab ancaq xüsusi akademik dərəcə və adları olan və elmi tədqiqatlar aparan alimlər üçün nəzərdə tutulmuşdur.

Açıq şəkildə ifadə etsək, əsər Ulu Öndər Heydər Əliyevin fəaliyyətinin fəlsəfi-elmi dərki baxımından ümummilli liderlik nümunəsi və təcrübəsi ilə bağlıdır. Fəqət, Ümummilli liderliyin miqyası və missiyası və fəlsəfi tədqiqi üçün ilkin meyarlar tam şəkildə göstərilməyib. Mövzu abstraktlaşmış və bu səbəbdən məsələyə Heydər Əliyev təcrübəsi kontekstində nümunələr qeyd edilməmişdir. Təbii ki, hər bölmə üzrə Ümummilli Liderliyin Heydər Əliyev təcrübəsini aydın nümunələr və müəyyən edilmiş meyarlar daxilində

göstərmək olardı. Bu mənada fəlsəfi-elmi tədqiq (konkret nümunələr üzərindən) aktual məsələlərdən hesab edilə bilərdi.

Əsərdə müxtəlif nəzəriyyələr, fəlsəfi təhlillər, fərqli yanaşmalar, Şərq və Qərb mütəfəkkirlərinin əsaslandırmaları kifayət qədər yer alıb, lakin bütün bunlara rəğmən əsər tam elmi xarakter daşıyır və abstrakt təəssüratı formalaşdırır. Çünki kitabda göstərilən mövulara uyğun məqamlar Heydər Əliyevin real həyatından seçilib verilməmişdir.

Kitabda fənlərarası elmi istiqamət müxtəlif təbiətli mürəkkəb sistemlərin xaosdan nizamlılığa və bir nizamlılıq səviyyəsindən digər nizamlılıq səviyyəsinə (və əksinə) keçidin ümumi mexanizmləri kifayət qədər təfərrüatlı araşdırılsa da, izahlar mürəkkəbləşdirilmiş, elmi məntiq və terminlərlə qəlizləşdirilmiş formda təqdim edilmişdir. Sanki kütlə üçün nəzərdə tutulmamış və yalnız elm adamları üçün xüsusi şəkildə yazılmışdır. Amma onu vurğulamaq lazımdır ki, siyasi liderliyin, idarəetmənin və dövlətə rəhbərliyin fənlərarası aspektdə fəlsəfi-elmi araşdırılması kimi bu növ mövzular dünya miqyasında son dərəcə aktualdır və ictimaiyyətə xitabən təqdim edilməkdədir. Fikrimcə, Heydər Əliyev fenomenini bütöv bir xalqın, dövlətin, millətin, regionun taleyində çox əhəmiyyətli rol oynamış bir şəxsiyyətin məhz həmin kontekstdə fəaliyyətinin dərin və geniş öyrənilməsi milli, regional, qlobal miqyaslarda dövlət başçılığı, liderlik tandeminin oynadığı rolun müasir tələblərə uyğun dərk edilməsi və Heydər Əliyevin dövlət rəhbəri, liderliyi miqyasında fəaliyyətinin fəlsəfə ilə elmin nəzəri-metodoloji ortaq sahəsində tədqiqinin aydın nümunələrlə və müəyyən iqtibaslarla verilməsi geniş oxucu təbəqəsinə müsbət təsiretmə baxımından və effektivlik nöqteyi nəzərindən daha geniş prizmada adekvat anlamağa yardım edə bilərdi.

İstinadlar və biblioqrafiyada göstərilən ədəbiyyat siyahısında da uyğunsuzluqlar müşahidə edilir. Aydındır ki, istinadlar və biblioqrafiyanın düzülüşü elmi mövzunu araşdırmağa başlayan zaman ortaya çıxan ehtiyaclardan biridir. Lakin əsərdə bir sıra uyğunsuzluqlar həm istinadvermədə həm də nömrələnmədə görünür. Ən əsası isə istinad normalarından hansına (APA, MLA, Harvard reference style) əsaslanıb istinad verilib tam aydın deyil. Çünki demək olar hər bir stilə uyğun istinad forması mövcuddur.

## 6.Yekun

Yekun olaraq bunu qeyd edə bilərik ki, təqdim edilən kitab bu sahədə bir çox boşluqları dolduraraq, bu sahədə qələmə alınan əsərlərdən müsbət mənada ciddi şəkildə fərqlənir və üslubiyyət, təhlil və fəlsəfi yanaşma aydın şəkildə sezilir. Bu da əsərin keyfiyyətli olmasına və ciddi şəkildə işlənilməsinə əsas vermişdir.

Konkret olaraq kitabda liderlik müasir fənlərarası yanaşma çərçivəsində formalaşan metodologiya əsasında araşdırılmış və onun fəlsəfi izahına cəhd edilmişdir. Müəllif bu məqsədlə müəyyən etdiyi fənlərarası xarakterli metodoloji prinsiplərdən yararlanmışdır. Bu yanaşmanı qnoseoloji və metodoloji aspektlərdə təhlil etdikdə fəlsəfə ilə elmin ortaq sahəsində liderliyin dərki kimi də qəbul etmək olar. Ümumiyyətlə, liderliyin fəlsəfi-elmi araşdırılması nəticəsində alınan qənaətlərin Ümummilli Lider Heydər Əliyevin liderliyinin fəlsəfi-elmi dərk edilməsinə tətbiqi maraqlı məqamları üzə çıxarmışdır. Aydın olmuşdur ki, Heydər Əliyev öz fəaliyyəti ilə faktiki olaraq yeni liderlik modelini yaratmışdır. Bu istiqamətdə araşdırmaların siyasi varislik bağlılığında Prezident İlham Əliyevin liderliyi nümunəsində davam etdirilməsi zərurəti dərk edilmişdir.

## ƏDƏBİYYAT (REFERENCES)

**1.** Qurbanov, F. (2023). *Heydər Əliyev və yeni liderlik: fəlsəfi-elmi təhlil*. Bakı, Elm və Təhsil nəşriyyatı, 324 s. (in Azerbaijani)

**2.** Məlikov, Ə. (2020). Beynəlxalq “OCLC” təşkilatı və onun fəaliyyət mexanizmi haqqında. *Kitabşünaslıq və Redaktor Sənəti jurnalı (ISSN:2617-6939), 2020, №2*, səh.37-41. (in Azerbaijani) (http://dx.doi.org/10.13140/RG.2.2.15506.38080) (in Azerbaijani)

**3.** Məlikov, Ə. (2020). “ORCID”in mahiyyəti, faydası və əldə edilməsi. *Kitabşünaslıq və Redaktor Sənəti jurnalı (ISSN:2617-6939), 2020, №1*, səh.45-49. (http://dx.doi.org/10.13140/RG.2.2.13671.37288) (in Azerbaijani)

**4.** Əmirov, E., & Məlikov, Ə. (2020). Rəhbər və başçı: fərq nədir? (Tarixi-politoloji nəzər). *Elm və Həyat jurnalı (ISSN:2710-0944), №4,* səh.25-31. (http://dx.doi.org/10.13140/RG.2.2.22196.37763) (in Azerbaijani)

**5.** Qurbanov, F. (2023). *Heydər Əliyev irsinin fəlsəfi-elmi araşdırılması: vəzifələr və perspektivlər*. Bakı, Xalq qəzeti, 18.07.2023. səh 7. (in Azerbaijani)